"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ



H.Əliyev

"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"




ADPU 100

## Azərbaycanın mədəniyyət paytaxtı Şuşada tarixi "Xarıbülbül" musiqi festivalı

*Mayın 12-də Azərbaycanın mədəniyyət paytaxtı Şuşa "Xarıbülbül" musiqi festivalına ev sahibliyi elədi. Qədim mədəniyyət beşiyi Şuşa 29 ildən sonra yenə doğmalarını, qonaqlarını qarşıladı. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev, birinci xanım Mehriban Əliyeva, qızları Leyla Əliyeva və Arzu Əliyeva Şuşada Cıdır düzündə təşkil olunan "Xarıbülbül" musiqi festivalına gəldilər.*

*Xatırladaq ki, "Xarıbülbül" Beynəlxalq Festivalı məşhur xanəndə Seyid Şuşinskinin 100 illik yubileyi münasibətilə 1989-cu ildən keçirilməyə başlayıb. Festival hər il may ayında onlarla xarici və sovet ölkələrinin iştirakı ilə keçirilib və təkcə Azərbaycanda deyil, bütün dünyada ən vacib mədəniyyət tədbirlərindən biri hesab olunurdu.*

**Festivalda dövlət başçısı, Müzəffər Ali Baş Komandan İlham Əliyev çıxış edərək buradan dünyaya sülh mesajı verdi. Prezidentin çıxışına tezislər şəklində diqqət edək:**

– Uzun fasilədən sonra bu il birinci dəfə keçirilən "Xarıbülbül" musiqi festivalı şəhidlərimizin əziz xatirəsinə həsr olunub. Biz bu günü bizim qəhrəman hərbçilərimizə borcluyuq, Azərbaycan xalqına borcluyuq. Xalq birləşdi, xalq həmrəylik göstərdi, bir yumruq kimi birləşdi və bu Qələbəni Azərbaycan xalqı qazandı. Bu, bizim hamımızın qələbəsidir.

– Vətən müharibəsi bir daha onu göstərdi ki, Azərbaycanda bütün xalqlar dostluq, qardaşlıq, həmrəylik şəraitində yaşayır və bu 44 günlük müharibə bir daha onu göstərdi ki, ölkəmizdə milli birlik, milli həmrəylik vardır. Təsadüfi deyil ki, birinci festivalda Azərbaycanda yaşayan xalqların nümayəndələri çıxış edəcəklər və bir daha biz bütün dünyaya buradan - Şuşadan, qədim torpağımızdan mesaj veririk. Ölkələr belə inkişaf etməlidir, ancaq çoxkonfessiyalı, çoxmillətli ölkələrdə, cəmiyyətlərdə inkişaf olur, birlik olur, milli həmrəylik olur, sülh olur.

– Baxmayaraq ki, işğalçılar bizə qarşı tanklardan, toplardan atəş açırdılar. Biz Şuşa uğrunda gedən döyüşlərdə şəhidlər verdik. Ancaq bizi irəliyə aparan milli ruh bu Qələbəni təmin etdi. Şuşanın azad edilməsi faktiki olaraq Ermənistan ordusunun və Ermənistan dövlətinin çökməsi demək idi. Çünki ondan bir gün sonra Ermənistan məcbur olub bizim şərtlərimizə əsasən formalaşmış kapitulyasiya aktına imza atıb və biz bir güllə atmadan Laçın, Kəlbəcər və Ağdam rayonlarını geri qaytardıq. Təsadüfi deyil ki, Şuşanın azad edilməsi günü - 8 noyabr günü Azərbaycanda rəsmi dövlət bayramı elan edildi, Zəfər bayramı elan edildi və biz bu bayramı hər il qeyd edəcəyik.

– Şuşa Azərbaycan xalqının milli sərvətidir. Bu yaxınlarda Şuşanın Azərbaycanın mədəniyyət paytaxtı elan edilməsi bunu bir daha göstərir. Şuşa qədim Azərbaycan şəhəridir. Gələn il biz Şuşanın 270 illiyini qeyd edəcəyik. Pənahəli xan 1752-ci ildə Şuşanın təməlini qoyub və o vaxtdan işğal dövrünə qədər bu şəhərdə həmişə azərbaycanlılar yaşayıblar. Ermənilər nə qədər çalışsalar da, Şuşadan Azərbaycan ruhunu silə bilmədilər.

– Mən dünyada Şuşaya bənzər şəhər görməmişəm, bəlkə də yoxdur. Bu gün biz uzun fasilədən sonra azad Şuşada yığışmışıq. Bu gün Cıdır düzündə Azərbaycan muğamı səslənəcək. Uzun fasilədən sonra biz Şuşada bu gözəl musiqi bayramını qeyd edəcəyik. Bu gün, sözün əsl mənasında, musiqi bayramıdır. Bəli, biz 8 noyabrda Şuşaya döyüşərək, vuruşaraq, qan tökərək qayıtmışıq. Ancaq bu gün Azərbaycan mədəniyyəti, Azərbaycan mədəniyyətinin görkəmli nümayəndələri Şuşaya qayıdıblar və bu qayıdış reallıqdır, bu reallıqla hər kəs hesablaşmalıdır.

– Bundan sonra biz Şuşada əbədi yaşayacağıq və Şuşanın bərpa edilməsi artıq başlanmışdır. Verilən göstərişlər yerinə yetirilir. Artıq Yuxarı Gövhərağa məscidi təmir edilib və sabah orada bayram namazı qılınacaq.

– Festivalın məhz Ramazan bayramı ərəfəsində təşkil edilməsi də təsadüfi deyil. Biz öz dini, milli, mənəvi köklərimizə bağlı olan xalqıq. Əks-təqdirdə, biz heç vaxt işğala son qoya bilməzdik. Biz bütün bu illər ərzində bir amalla yaşamışıq -




torpaqları azad edək, ədaləti bərpa edək, milli ləyaqətimizi qoruyaq və buna nail olduq. Beş il bundan əvvəl Cocuq Mərcanlı işğaldan azad olunandan sonra orada mən Şuşa məscidinin bənzəri olan məscidi tikdirdim. O vaxt məscidin açılışında demişdim ki, gün gələcək biz Şuşada məscidləri bərpa edəcəyik və yeni məscidlər tikiləcəkdir. Bu gün Ramazan bayramı ərəfəsində Şuşada yeni möhtəşəm məscidin təməli qoyuldu. Ermənilər tərəfindən qurudulmuş "Xan qızı Natəvan" bulağından bu gün su gəldi. Bütün bunlar böyük rəmzi məna daşıyır. Bax, bizim qayıdışımız budur.

– İndi isə biz burada, Cıdır düzündə – hər bir azərbaycanlı üçün müqəddəs olan yerdə yığışmışıq və bu musiqi bayramını, bu birlik bayramını, bu qayıdış bayramını, bu ləyaqət bayramını qeyd edirik. Yaşasın Şuşa! Yaşasın Qarabağ! Yaşasın Azərbaycan!

## Rektorun "Republika Günü" təbriki



səh.2

## "ADPU öz tələbələrini universitetin sosial-ictimai işinə yaxından cəlb edir"




səh.3

## Tələbələrin 60%-i ilə onlayn görüşlər keçirilib



səh.4

## Filiallarımızın fəaliyyəti



səh.5

Qəzet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur.

63

May, 2021 / № 05 (1108)

# 28 May – Respublika Günü münasibəti ilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru, professor Cəfər Cəfərovun TƏBRİKİ

**Hörmətli professor-müəllim heyəti və universitetimizin əməkdaşları!**
**Əziz tələbələr!**

Sizi 28 May - Respublika Günü münasibətilə səmimi qəlbdən təbrik edirəm. Sevindirici haldır ki, bu il xalqımız müstəqillik dövründə ilk dəfə olaraq bütün milli bayramlarını torpaqlarımızın işğaldan azad olunduğu, təcavüzkar Ermənistanın təslimçilik aktını imzalamağa məcbur edildiyi bir şəraitdə, yüksək qələbə əhval-ruhiyyəsi və böyük iftixar hissi ilə qeyd edir.

Müsəlman Şərqinin ilk demokratik respublikası olan Azərbaycan Xalq Cümhuriyyəti 103 il bundan öncə xalqımızın zəngin dövlətçilik ənənələrinə, humanist dəyərlərinə söykənərək dünyanın ən demokratik sistemlərindən birini yaratmış, ana dilində elmin və təhsilin inkişafını,
qadınların cəmiyyət həyatında rolunu prioritet vəzifələrdən biri elan etmişdir. Dünyanın demokratiya beşiyi sayılan bir çox Qərb dövlətlərindən əvvəl məhz Azərbaycanda qadınlara səsvermə hüququ verilmiş, dinindən, dilindən, irqi və cinsi mənsubiyyətindən asılı olmayaraq, bütün insanların bərabərliyi və birliyi ideyası ən yüksək siyasi səviyyədə dövlətin təməl doktrinasında bəyan edilmiş, praktikada tətbiq olunmuşdur.



Azərbaycan Xalq Cümhuriyyətinin tariximizdəki yeri və roluna xüsusi dəyər verən ümummilli lider Heydər Əliyev deyirdi: "Biz ilk Demokratik Cümhuriyyətin yaranması gününü əziz tutaraq onu Azərbaycanın dövlət müstəqilliyi günü - Respublika Günü elan etmişik və bu, bizim milli bayramımızdır". Müasir Azərbaycan dövlətinin banisi Heydər Əliyev bu fikri ilə sanki Azərbaycan Xalq Cümhuriyyəti qurucularının siyasi irsinə xalqımızın hörmət və ehtiramını ifadə edirdi.
Cümhuriyyətin 100 illik yubileyi ərəfəsində Prezident İlham Əliyev 2018-ci ili ölkəmizdə "Azərbaycan Xalq Cümhuriyyəti İli" elan etdi. Sərəncama uyğun olaraq, yubiley ölkəmizdə və onun hüdudlarından kənarda təntənəli şəkildə qeyd olundu, bu münasibətlə xüsusi xatirə medalı təsis edildi.
Bu gün Azərbaycan Prezidenti cənab İlham Əliyevin gələcəyə hesablanmış, xalqımızın milli-mənəvi dəyərlərinə və dövlətçilik maraqlarına əsaslanan ardıcıl siyasəti ölkəmizi sürətli inkişaf yoluna çıxararaq dünyada mövqeyini möhkəmləndirmişdir. İşğal altında olan Qarabağ torpaqları uğrunda mübarizəni Vətən müharibəsinə çevirən xalqımız məkrli düşmən üzərində böyük Zəfər qazanmaqla dövlətimizin ərazi bütövlüyünü bərpa etdi. İndi ölkəmiz inkişafın və quruculuq işlərinin yeni mərhələsinə qədəm qoyur. Prezident İlham Əliyevin sözləri ilə desək, "Biz Azərbaycan Xalq Cümhuriyyətinin qurucularının arzularını reallığa çevirdik. Biz elə bir dövlət qurduq ki, əminəm, hər bir Azərbaycan vətəndaşı, hər bir azərbaycanlı bu dövlətlə fəxr edir. Mən tam əminəm ki, əgər Azərbaycan Xalq Cümhuriyyətinin quruculari bugünkü Azərbaycanı görə bilsəydilər, onlar da ölkəmizlə fəxr edərdilər."
**Əziz həmkarlar və tələbələr!**
Sizi bir daha bu əlamətdar gün münasibəti ilə ürəkdən təbrik edir, müəllimlər ordusu və gələcəyin layiqli mütəxəssisləri olaraq, ölkəmizin böyük Zəfərdən sonrakı yeni inkişaf mərhələsində görülən möhtəşəm işlərdə pay sahibi olmaq üçün əlimizdən gələni əsirgəməməyə səsləyir, habelə tələbələrimizə təhsildə böyük müvəffəqiyyətlər və qarşıdakı imtahan sessiyasında uğurlar arzulayıram!

## "Müqəddəs amal fədaisi - Nəriman Nərimanov" Respublika elmi-praktik konfransı keçirilib

Aprelin 30-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rəhbərliyinin təşəbbüsü ilə Azərbaycanın görkəmli dövlət və ictimai xadimi Nəriman Nərimanovun 150 illik yubileyinə həsr olunmuş "Müqəddəs amal fədaisi - Nəriman Nərimanov" Respublika elmi-praktik konfransı keçirilib.

Universitetin rektoru, professor Cəfər Cəfərov N.Nərimanov şəxsiyyətinin ucalığı haqqında söz açaraq xalqımızın böyük oğlunun çoxşaxəli fəaliyyətinin dövlət başçısı cənab İlham Əliyev tərəfindən də yüksək qiymətləndirilərək ötən il N.Nərimanovun 150 illik yubileyinin qeyd olunması ilə bağlı Sərəncam imzalandığını vurğulayıb. Rektor N.Nərimanovun həm də ADPU-nun yaradılmasında bilavasitə rol oynadığını və 100 il öncə Ali Türk Pedaqoji İnstitutunun yaradılması haqqında dekreti məhz hökumət başçısı onun imzaladığını diqqətə çatdırıb.

Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov N.Nərimanovun ictimai, dövlət, pedaqoji xadim kimi hərtərəfli fəaliyyətindən söz açıb.

Ədəbiyyat kafedrasının müdiri, dosent Razim Məmmədov "Nəriman Nərimanovun maarifçilik görüşləri", İbtidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov "Nəriman Nərimanov şəxsiyyəti və Pedaqoji Universitet", Ədəbiyyat kafedrasının professoru Təyyar Cavadov "Nəriman Nərimanov yaradıcılığında "uçqun dərələr" problemi", Azərbaycan tarixi kafedrasının müdiri, dosent Naibə Əhmədova "Nəriman Nərimanovun siyasi dünyagörüşündə milli məsələ", həmin kafedranın professoru Xaqani Məmmədov isə "Nəriman Nərimanovun Türkiyənin istiqlal hərbində rolu" mövzularında geniş təhlili çıxışlar ediblər.



## Fizika fakültəsi müntəzəm onlayn tədbirlər icra edib



**"Dəvətli professor" layihəsi**

ADPU-nun Fizika fakültəsinin dekanı, dosent Arzu Daşdəmirovun təşəbüssü ilə keçirilən və onlayn formatda təşkil edilən "Dəvətli professor" layihəsi çərçivəsində ölkəmizdə fəaliyyət göstərən digər ali təhsil müəssisələrində çalışan tanınmış professorlar və qabaqcıl müəllimlər Fizika fakültəsinin tələbələrinə fizikanın müxtəlif bölmələrindən bakalavriat tələbələrinə mühazirələr oxuyacaq. Layihənin təşkilində məqsəd ADPU və pedaqoji kadr hazırlığı ilə məşğul olan digər ali təhsil müəssisələri arasında inteqrasiyanın qurulması, təlim-tədris prosesinin keyfiyyətinin və əhatə dairəsinin genişləndirilməsinə xidmət edən bilik mübadiləsinin aparılmasıdır. Mayın 3-dən start götürən layihədə ilkin olaraq Bakı Dövlət Universitetinin fizika üzrə tanınmış alimlərinin mühazirələri təşkil edilir.

**Elmi seminar: "Cu1.75Te və onun əsasında alınmış halkogenidlərdə polimorf çevrilmələr"**

Mayın 4-də ADPU-nun Fizika fakültəsində onlayn elmi seminar keçirilib. Elmi seminarda Fizika fakültəsinin professor-müəllim heyəti, magistrantlar və doktorantlar iştirak edib. Seminarda ADPU-nun Quba filialının direktoru, fakültənin Elmi-tədqiqat qrupunun üzvü, fizika üzrə fəlsəfə doktoru, dosent Yusif Alıyev mövzu üzrə məruzə ilə çıxış edib. Elmi seminarın rəhbəri, dosent Aydın Ələkbərov məruzəçini seminar iştirakçılarına təqdim edib. Dos. Y.Alıyev kristalloqrafiya sahəsində tanınmış alimlərdəndir. O, Cu_1.70 Cd_0.05 Te və Cu_1.75 Te tərkibinin yüksək temperaturlarda rentgen difraksiyası spektrləri, halkogenidlərdə polimorf çevrilmələrdə temperaturun rolu, Cu, Zn, Cd elementlərinin valentlik vəziyyəti və ion radiusları haqqında apardığı elmi-tədqiqat işlərinin nəticələrini seminar iştirakçılarına təqdim edib.

**"Sən elə bir zirvəsən" adlı onlayn tədbir keçirilib**

Mayın 8-də ADPU-nun Fizika fakültəsinin Yeni Azərbaycan Partiyasının (YAP) təşkilatçılığı ilə Ulu Öndər Heydər Əliyevin anadan olmasının 98 illdönümünə həsr olunmuş "Sən elə bir zirvəsən" adlı onlayn tədbir keçirilib. Tədbirdə sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, fakültə dekanı, dosent Arzu Daşdəmirov, fakültə YAP-ın sədri, baş müəllim Əsmət Teymurova, fakültə Tələbə Elmi Cəmiyyətinin (TEC) sədri, dosent Xatirə Adgözəlova, YAP-ın Səbail rayonu üzrə "Pedaqoqlar" ilk ərazi təşkilatının sədr müavini, dosent Soltanəli Qurbanov, fakültənin professor-müəllim heyəti və tələbələr iştirak edib.
Əvvəlcə Ulu Öndər Heydər Əliyevin xatirəsi bir dəqiqəlik sükutla yad edilib. Tədbirdə b/m Ə. Teymurova giriş nitqi söyləyib. Ardınca dos. A. Daşdəmirov, dos. S. Qurbanov, "Ümumi fizika" kafedrasının baş müəllimi Hüseyn Aslanov, "Fizikanın tədrisi texnologiyası" kafedrasının dosenti Əfqan Kərimov və digərləri öz təəssüratlarını bölüşüblər . Tədbirin gedişində H.Əliyevin şərəfli həyat yolundan bəhs edən video nümayiş etdirilib, tələbələr şeirlər səsləndirib.

**Praktik Bacarıqlar Mərkəzinin növbəti onlayn seminarı keçirilib**

Mayın 8-də keçirilən ADPU-nun Fizika fakültəsinin Praktik Bacarıqlar Mərkəzinin onlayn seminarında müasir dövrdə Azərbaycanın fizika üzrə ən gənc elmlər doktoru, "Ümumi fizika" kafedrasının dosenti Sakin Cabarov "Beynəlxalq elmi bazalarda indekslənən jurnallarda çap olunan məqalələrə qoyulan tələblər" mövzusunda çıxış edib.

## "ADPU TV"-nin universitetdə onlayn-şifahi imtahanla bağlı xüsusi reportajı

Reportajda ADPU-da yaz imtahan sessiyası və yekun dövlət attestasiyasının onlayn-şifahi formada təşkili qaydalarına tələbələrdən gələn suallar əsasında tam aydınlıq gətirilir.

Universitetin mətbuat katibi Cavid Hüseynovun suallarını tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov cavablandırır.

***Əziz oxucu!***
***Xüsusi reportajı QR kodu smartfonunuzda oxudaraq izləyə bilərsiniz.***



## "Qarabağ Azərbaycandır! Müharibədən Qələbəyə" mövzusunda Respublika elmi konfransı keçirilib

Mayın 4-də onlayn formatda keçirilən konfransı ADPU-nun rektoru, professor Cəfər Cəfərov giriş sözü ilə açaraq Qarabağ uğrunda müharibədə Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin səriştəli rəhbərliyi ilə qazanılmış Böyük Qələbənin hər bir azərbaycanlı üçün qürurverici olduğunu vurğuladı. Şəhidlərimizin və qazilərimizin öz canı və qanı bahasına işğal altında olan torpaqlarımızın mənfur düşməndən təmizlənməsində danılmaz igidliklərdən söz açdı. Konfransın yüksək səviyyədə təşkilinə və keçirilməsinə görə Təşkilat Komitəsinə təşəkkürlərini bildirib.




Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov Ermənistan – Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin yaranması səbəblərini, münaqişənin həlli istiqamətində beynəlxalq təşkilatların 30 ilə yaxın fəaliyyətlərinin heç bir nəticə vermədiyini diqqətə çatdırdı. Bütün Azərbaycan vətəndaşlarının, dünya azərbaycanlılarının, həmçinin haqq və ədalət tərəfdarı olan dünya dövlətlərinin və millətlərinin mənəvi dəstəyi ilə Azərbaycan Ordusunun Dağlıq Qarabağı və ətraf rayonları 44 gün ərzində işğaldan azad etməsinin mümkünlüyünü Azərbaycan Respublikası Prezidenti möhtərəm İlham Əliyevin rəhbərliyi ilə aparılan uğurlu daxili və xarici siyasətin məntiqi nəticəsi kimi qiymətləndirib.

Açılış nitqlərindən sonra ADPU-nun professoru Oqtay Sultanov "Ərazi bütövlüyümüzün təmin olunmasında diplomatiyanın rolu", İsveçin UMEA Universitetinin dosenti Səadət Kərimi "İsveçdə Azərbaycan ziyalılarının Qarabağ uğrunda informasiya cəbhəsində apardığı savaş", Türkiyənin EGE Universitetinin professoru Dr. Aydın İbrahimov "Erməni camiyyətinin xüsusiyyətləri", Avstraliyanın Makkuori Universitetinin professoru Dr. Əli Əkbər Rəsuli "Azərbaycanın işğaldan azad edilmiş torpaqlarının xəritələşdirilməsində peyk təsvirlərinin qabaqcıl emalı prosedurlarının tətbiqi", ADPU-nun dosenti Yasin Qaraməmmədli "Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi konfliktoloji baxımdan" mövzularında məruzələrlə çıxış etdilər.

## "Nizami yaradıcılığının tədrisi tarixi və metodikası" mövzusunda elmi seminar

Mayın 5-də ADPU-nun Filologiya fakültəsinin Ədəbiyyatın tədrisi texnologiyası kafedrası tərəfindən keçirilən seminarda kafedranın dosenti, pedaqogika üzrə fəlsəfə doktoru Bilal Həsənli böyük şairin bədii irsinin tədrisi tarixindən danışmış, ümumtəhsil məktəblərinin ədəbiyyat proqram və dərsliklərinə Nizami əsərlərinin tədris materialı kimi daxil edilməsini şairin irsinə ehtiram və təzahürün ifadəsi, əsərlərindəki ideyaların başəriliyi və müasirliyi kimi qiymətləndirib. Metodist alim dərslik sahəsindəki xidmətlərinə görə Beynəlxalq əlaqələr üzrə prorektor,



Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynovanın onu "Fəxri Fərman"la təltif etməsinə görə təşəkkürünü bildirib. Seminarın gedişində alim Azərbaycan dili və ədəbiyyat müəllimliyi ixtisası tələbələrinin Nizami əsərlərinin tədrisi metodikası ilə yeni nəsil dərsliklərdə şairin irsinə münasibətlə bağlı suallarına aydınlıq gətirib.

## "Şumer-Azərbaycan ədəbi əlaqələri" mövzusunda növbəti elmi seminar




Mayın 20-də keçirilən ADPU-nun Filologiya fakültəsinin "Şumer-Azərbaycan ədəbi əlaqələri" mövzusunda növbəti elmi seminarının qonağı filologiya elmləri doktoru, şumeroloq alim, AMEA Folklor İnstitutu Folklor və yazılı ədəbiyyat şöbəsinin elmi işçisi İslam Sadıq olub.

Seminarı giriş sözü ilə açan Beynəlxalq əlaqələr üzrə prorektor, fakültə dekanı, professor Mahirə Hüseynova bəşər tarixində şumer mədəniyyətinin izlərindən danışıb.

İslam Sadıq şumer əlifbası və şumer dili, ortaq şumer-türk sözləri, şumer folkloru və "Kitabi-Dədə Qorqud", şumer panteonunda yaradıcı tanrılarla bağlı araşdırmalarını seminar iştirakçılarıyla bölüşüb. Alimin "şumerlərin qədim məskəni Azərbaycan ərazisi olmuşdur" fikri iştirakçılar tərəfindən maraqla qarşılanıb. Elmi seminarda iştirak edən doktorant, magistrant və tələbələr onları maraqlandıran suallarla təqdimatçıya müraciət ediblər. Yekunda prof. M.Hüseynova İ.Sadığın tələbələrə şumer ədəbiyyatı və dili dərədə mühazirələr oxumaq təklifini məmnuniyyətlə qəbul edib və təşəkkürünü bildirib.

## "ADPU öz tələbələrini universitetin sosial-ictimai işinə yaxından cəlb edir"

Bu barədə ADPU-nun mətbuat katibi açıqlama yayıb. Açıqlamada deyilir: "100 illiyini qeyd edən, 18 minə yaxın tələbəsi olan Pedaqoji Universitetin tədrisdən başqa, sosial-ictimai həyatı da diqqət çəkir. Universitetin qaynar sosial həyatında müvəqif struturkturlarla yanaşı tələbələri də xüsusi rol oynayır. ADPU-da ümumilikdə 5 tələbə təşkilatı fəaliyyət göstərir. Lakin sosial fəaliyyətlərindən söz açacağımız tələbələrimiz tələbə təşkilatlarının aktivləri deyil, universitetin gündəlik işində birbaşa iştirak edən bacarıqlı gənclərdir. Qeyd edək ki, universitetin sosial media hesablarını idarə edən ADPU Sosial Media Marketinq komandasının 7 nəfər üzvündən 4-ü – Asim İbrahimov, işində birbaşa iştirak edən bacarıqlı gənclərdir. Nazilə Abdullayeva, Sara Mehtiyeva və Vüsalə Bədirova universitetin tələbələridir. Cari ilin mart ayında fəaliyyətə başlayan universitetin onlayn internet televeziyası - "ADPU TV"-nin yayım və texniki heyəti, aparıcıları, ssenaristləri və digər üzvləri də tələbələrimizdən ibarətdir. "Youtube" platforması üzərindən fəaliyyət göstərən televiziyaya ümumi nəzarəti universitetin Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin əməkdaşları həyata keçirsə də, aparıcı qüvvələri tələbələr içərisindən seçilmişdir. Məsələn, belə tələbələrdən yayım heyəti rəhbəri Esmira Musalı və heyətin digər üzvləri, aparıcılar Nərgiz Quluzadə, Arzu Əliyeva, Əli Məmmədzadə, Zərifə Almazova və digərlərini misal çəkmək olar. ADPU-nun mətbu orqanı – "Gənc Müəllim" qəzetinin redaktorları arasında da yer alan tələbəmiz Asim İbrahimov həm də universitetin "Telegram" tətbiqindəki süni intellekt robotu olan "ADPUBot"un da əsas müəlliflərindəndir. Hazırda son hazırlanma mərhələsində olan ADPU-nun mobil tətbiqinin müəllifi isə ADPU SMM komandasının üzvü olan Vüsalə Bədirovadır. Universitetin 100 illiyi münasibətilə hazırlanan "ADPU-nun Qəhrəmanları" və "ADPU haqda 100 fakt" kitabının həmmüəllifləri arasında da universitetin fəal tələbələri yer alır. Ümumilikdə Pedaqoji Universitetin 100 illik yubileyi ərəfəsində aparılan fəaliyyətlərə universitetin 30-a yaxın tələbəsi könüllü surətdə qoşulmuş və adlarını ADPU-nun tarixinə qızıl hərflərlə yazdırmaqdadırlar. Hazırda ali təhsil müəssisəsinin sosial-ictimai fəaliyyətində misilsiz xidmətləri olan bu kimi tələbələrimiz universitet rəhbərliyinin diqqət mərkəzindədir. ADPU-nun öz məzunlarını əmək fəaliyyətinə cəlb etməsi isə artıq ənənə halını almışdır. Təhsil dövründə universitetin sosial-ictimai fəaliyyətində xüsusi fərqlənən tələbələrdən bir çoxu məzun olduqdan sonra universitetdə işə qəbul olunurlar. Təsadüfi deyil ki, bir müddət əvvəl universitetin ötənilki məzunlarından bir neçə nəfəri işə götürülüb. Əminliklə qeyd etmək olar ki, Pedaqoji Universitet öz tələbə və məzunlarını hər zaman təlim-tədris və sosial-ictimai fəaliyyətinə cəlb etməkdə maraqlıdır və onların əməyini yüksək qiymətləndirir."




## Məktəbəqədər təhsil fakültəsində Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 98-ci ildönümünə həsr olunmuş TEC-in konfransı keçirilib

Mayın 7-də ADPU-nun Məktəbəqədər təhsil fakültəsi Tələbə Elmi Cəmiyyətinin (TEC) Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 98-ci ildönümünə həsr olunmuş konfransı keçirilib. Konfransda fakültə rəhbərliyi, kafedra müdirləri, müəllim və tələbələr iştirak edib. Plenar iclası giriş sözü ilə açan, fakültə dekanı, p.ü.e.d. Şəhla Əliyeva konfransın işinə uğurlar arzulayıb.

Moderator, fakültə TEC-in sədri Turan Şahvəladli-Qədimova məruzəçilərə söz verib. Məktəbəqədər təhsilin pedaqogikası kafedrasının müdiri, professor Müseyib İlyasov və Məktəbəqədər təlim və tərbiyə ixtisasının VI kurs tələbəsi Güldanə Əhmədova olduqca məzmunlu məruzələr ediblər. Sonra dekan müavini, dosent Allahyar İmanov və dosent Şərafət Baxışova məruzələr ətrafında öz fikirlərini bölüşüblər.

Konfrans öz işini Məktəbəqədər təlim və tərbiyə, Psixologiya və Korreksiyaedici təlim bölmələri üzrə davam etdirib. Bölmələrdə 200-dən çox tələbə elmi işlərini təqdim edib. Hər bölmə üzrə fərqlənən üç yer üçün 2 nəfər tələbə I, II və III yer diplomları ilə, eyni zamanda konfransda iştirak edən bütün tələblər sertifikatla təltif edilib. Konfransa təqdim olunan materiallar kitab halında nəşr edilib.

## "Heydər Əliyev: elm, təhsil və mədəniyyətin himayədarı" Respublika elmi konfransı keçirilib

Mayın 7-də ADPU-da "Microsoft Teams" platforması üzərindən "Heydər Əliyev: elm, təhsil və mədəniyyətin himayədarı" Respublika elmi konfransı keçirilib. Konfransı giriş sözü ilə açan universitetin rektoru, professor Cəfər Cəfərov iştirakçıları salamlayaraq bildirib ki, Respublika elmi konfransı Ulu öndər Heydər Əliyevin anadan olmasının 98-ci ildönümünə həsr olunub. Rektor öz çıxışında H.Əliyevin Azərbaycana rəhbərlik etdiyi hər iki dövrdə ölkəmizdə elm və təhsilin inkişafında yaşanan böyük irəliləyişlərdən, müəllim hazırlığındakı yeni mərhələdən, azərbaycanlı tələbələrin ittifaq ölkələrində təhsil almağa göndərilməsi, ölkədə ali təhsil müəssisələrinin sayının artırılması və Azərbaycanın tanınmış mədəniyyət xadimlərinin xatirələrinin əbədiləşdirilməsi, mədəni irsimizin dünyada təbliği, Kitabi Dədə-Qorqudun 1300 illiyi, Füzulinin anadan olmasının 500 illik yubileyinin keçirilməsi və s.-dən söz açaraq ADPU-da müəllim hazırlığı işinin Ulu öndərin vəsiyyətlərinə uyğun uğurla aparıldığını qeyd edib.



ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov "Heydər Əliyev və Azərbaycan elmi" mövzusunda, Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasının professoru, "Simurq" Azərbaycan Mədəniyyət Assosiasiyasının prezidenti Fuad Məmmədov "Heydər Əliyevin Azərbaycanda yüksək mədəniyyətli insanların formalaşmasında rolu" mövzusunda, ADPU-nun Riyazi analiz kafedrasının professoru Məlikməmməd Cəbrayılov isə "Heydər Əliyev və Azərbaycan təhsili" mövzusunda ətraflı məruzələr ediblər. Məruzələrdə Ulu öndərin ADPU-nun 50 və 60 illik yubileylərindəki şəxsən iştirak etməsindən, ümumən ötən əsrin 70-80-ci illərində Azərbaycanda elmi-pedaqoji potensialın əhəmiyyətli dərəcədə artmasından söhbət açılıb. Konfrans işini müzakirələrlə davam etdirib. Konfransda professor-müəllim heyəti, doktorantlar və tələbələr iştirak edib.

## Həmkarlar İttifaqı Komitəsinin fəaliyyəti

### Əməkdaş və tələbələr "Yubiley döş nişanı" ilə təltif edilib

Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqının yaranmasının 100 illiyi münasibəti ilə ADPU-nun Həmkarlar İttifaqının 20 nəfər üzvü, universitetin Tələbə Həmkarlar İttifaqının isə 19 nəfər üzvü Həmkarlar İttifaqı hərəkatında xidmətlərinə görə İttifaqın "Yubiley döş nişanı" ilə təltif edilib. Təltif olunanlar arasında o cümlədən ADPU-nun bütün filiallarının da nümayəndələri var.

### ADPU HİK-dən "Ramazan" xeyriyyə aksiyası



Azərbaycan Dövlət Pedaqoji Universiteti Həmkarlar İttifaqı Komitəsi (ADPU HİK) Ramazan Bayramı münasibətilə xeyriyyə aksiyası keçirib.

Aksiya çərçivəsində ADPU HİK tərəfindən 70 nəfər universitet əməkdaşına bayram sovqatı kimi ərzaq paketlərin təqdim edilib. Mayın 7-dən başlanan aksiya 12 maya qədər davam edib. Qeyd edək ki, ərzaq paketləri xüsusi karantin rejiminin tələbləri gözlənilməklə ADPU HİK nümayəndələri tərəfindən əməkdaşlara öz evlərində təqdim edilib.

## Tələbələrin 60%-i ilə onlayn görüşlər keçirilib

Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin təşkilatçılığı ilə mayın 20-dən etibarən başlanan və 5 gün ardıcıl davam edən yay imtahan sessiyası öncəsi tələbələrlə onlayn görüşlər yekunlaşıb. "Microsoft Teams" platforması üzərindən təşkil edilən silsilə görüşlərdə universitetin bütün fakültələrinin tələbələri könüllülük əsasında iştirak ediblər. Hazırlanmış qrafik üzrə beş gün ərzində ADPU rəhbərliyi universitetin 8 fakültəsi və SABAH Mərkəzinin ümumilikdə 6000-dək tələbəsi ilə görüş keçirib. Bu isə universitetin bakalavriat tələbələrinin 60%-i deməkdir. Bu tələbələri əhatə etmək baxımından onlayn formada universitetlərdə keçirilən ən əhatəli görüşlərdəndir.

Görüşlərin keçirilməsində əsas məqsəd cari semestrdə ADPU-da tətbiq edilən onlayn-şifahi imtahan forması ilə bağlı tələbələrə daha detallı izahat vermək, onların problemlərini dinləmək və suallarını cavablandırmaq, imtahan sessiyasına hazırlıq, İKT ilə bağlı texniki məsələlər və cari tədris semestrinin yekunlaşdırılması, yekun dövlət attestasiyası, buraxılış işləri, o cümlədən sosial həssas qrupa aid tələbələrin təhsil haqlarının ödənilməsi və s. məsələlərin aydınlaşdırılmasıdır.



ADPU-nun mətbuat katibi Cavid Hüseynovun moderatorluğu ilə hər bir fakültənin dekanı və professor-müəllim heyətinin də iştirakı ilə ayrı-ayrılıqda keçirilən və ortalama hər biri 2 saat müddətində davam edən görüşlərdə universitetin tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov imtahanların təşkili qaydaları ilə bağlı ətraflı çıxış edərək ADPU-da cari semestrdə tətbiq edilən onlayn- şifahi imtahan modelinin özəlliklərindən söz açıb, bu modelin mövcud pandemiya şəraiti və tələbələrin keyfiyyətli təhsil almaq, şəffaf qiymətləndirmə imkanlarını reallaşdırmaq baxımından hazırda ən uyğun variantlardan biri olduğunu bildirib.

Bundan başqa sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, Tədris departamentinin direktoru, dosent Sənan Əliyev, Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin müdiri Turan Kərimli və müvafiq fakültə dekanları da tələbələrə öz tövsiyələrini vermiş, qarşıdan gələn imtahan sessiyasında uğurlar arzulamışlar.

Tələbələrin sualları ətrafında davam edən görüşlər onlayn-şifahi imtahanlara hazırlıq baxımından olduqca əhəmiyyətli olub.

Qeyd edək ki, həm də ayrıca bütün fakültələrin professor-müəllim heyəti və rəhbərliyi ilə, o cümlədən ADPU-nun Quba, Şamaxı, Şəki, Ağcabədi və Cəlilabad filiallarının əməkdaş və tələbələri ilə də belə görüşlərin keçirilməsinə başlanılıb.

## Naxçıvan Müəllimlər İnstitutu ilə yeni əməkdaşlıq

Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) və Naxçıvan Müəllimlər İnstitutunda (NMİ) ölkəmizdə universitetlərarası əməkdaşlığın və innovativ təhsilin yeni bir modeli tətbiq edilmişdir. ADPU-nun Kimya və biologiya fakültəsinin Biologiya və onun tədrisi texnologiyası kafedrasının dosenti, pedaqogika üzrə fəlsəfə doktoru Gülşən Hacıyevanın və NMİ-nin Təbiət və incəsənət fakültəsinin Ümumi fənlər kafedrasının baş müəllimi, biologiya üzrə fəlsəfə doktoru Lamiyə Quliyevanın birlikdə təşkil etdikləri teleköprü üsulu ilə universitetlərarası "blok dərs" maraq doğurur. Biologiya müəllimliyi ixtisası üzrə təhsil alan III kurs tələbələrinə "Biologiyanın tədrisi metodikası" fənnindən "Fəal dərsin mərhələləri" mövzusunda keçirilən "blok dərs" zamanı hər iki təhsil müəssisəsinin tələbələri öncə fəal təlimin nəzəri əsasları və elmi-metodiki səciyyəsi barədə dos. G.Hacıyevanın çıxışını dinləmişlər. Daha sonra b/m L.Quliyeva bu təlimin praktik tətbiqini, bu zaman istifadə olunan tədris resurslarını və metodlarını nümayiş etdirmişdir.



Çıxış edənlər, ölkəmizin müxtəlif təhsil müəssisələri arasında qabaqcıl təcrübənin mübadiləsinin mühüm rolunu qeyd etmişlər.

Tədbirdə NMİ-nin prorektoru, psixologiya üzrə fəlsəfə doktoru Çapay Quliyev, Təbiət və incəsənət fakültəsinin dekanı, dosent Rövşən Vəliyev, Ümumi fənlər kafedrasının müdiri Qızıllı Əliyeva, ADPU-nun Tədris departamentinin direktoru, dosent Sənan Əliyev, Kimya - biologiya fakültəsinin dekanı, dosent Elnarə Mehbalıyeva, Biologiya və onun tədrisi texnologiyası kafedrasının müdiri, dosent Anaxanım Yusifova, kafedranın müəllimləri, magistrantları və tələbələri iştirak etmişlər.

## İKSAD ilə birgə ADPU-nun 100 illik yubileyinə həsr olunmuş beynəlxalq simpozium keçirilib

Mayın 24-25-i tarixlərində Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Türkiyə Cümhuriyyətinin İqtisadi İnkişaf və Sosial Araşdırmalar İnstitutu (İKSAD) ilə birgə ADPU-nun 100 illik yubileyinə həsr olunmuş "Elmdə və Təhsildə İnnovativ Texnologiyalar" III Beynəlxalq simpoziumu keçirilib. Açılış mərasimində ADPU-nun rektoru, professor Cəfər Cəfərov beynəlxalq elmi simpoziumun aktual əhəmiyyətini qeyd edib. Rektor İKSAD ilə ilk dəfə birgə təşkil olunan elmi simpoziumun Türkiyənin elm və təhsil qurumlarıyla ADPU arasında elmi əlaqələrdə yeni səhifə açdığını qeyd edib.

Çıxış edən İKSAD-ın rəhbəri, doktor Mustafa Latif Emek Azərbaycan ilə Türkiyə arasında dostluq əlaqələrinin inkişafını, elmi əməkdaşlığın genişlənməsində ADPU ilə birgə fəaliyyətdən məmnunluğunu ifadə edib, bu sahədə gələcəkdə də birgə tədbirlərin həyata keçiriləcəyini bildirib.

ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov simpoziumun mövzusunun elmi aktuallığını, Azərbaycan Prezidenti cənab İlham Əliyevin sərəncamı ilə 100 illik yubileyi qeyd olunacaq ADPU-nun elmin inkişafında və pedaqoji kadrların hazırlanmasında rolunu qeyd edərək, İKSAD ilə əməkdaşlığın elmi əlaqələrin daha da genişlənməsinə töhfə verəcəyini bildirib.



ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru, professor Mahirə Hüseynova elmi müzakirələrin beynəlxalq səviyyədə keçirilməsinin və İKSAD ilə səmərəli əməkdaşlığın əhəmiyyətini vurğulayaraq, əlaqələrin daha da möhkəmləndirilməsinin zəruriliyini göstərib. ADPU-nun Elmi-Tədqiqat Mərkəzinin müdiri, dosent Ərəstun Mehdiyev simpoziumun beynəlxalq statusa malik olaraq elmi müzakirələr üçün vacib platforma kimi əhəmiyyətini diqqətə çatdırıb. Sonra simpozium işini "Təhsil və pedaqoji-psixoloji tədqiqatlarda innovativ texnologiyalar", "Riyaziyyat, texnika və təbiət elmləri sahəsində fundamental tədqiqatlar və innovativ texnologiyalar" və "İctimai və humanitar elmlərdə innovativ araşdırmalar" bölmələrində davam etdirib. Azərbaycan, Türkiyə, Qazaxıstan, Əlcəzair, Mərakeş, Nigeriya, Filippin və başqa ölkələrdən təqdim olunmuş mövzular üzrə elmi məruzələr aparılıb.

# FİLİALLARIMIZIN FƏALİYYƏTİ

## Şamaxı Filialı

**"Uğurlu təhsil islahatlarının banisi – Ulu Öndər Heydər Əliyev" mövzusunda onlayn elmi seminar keçirilib**

Mayın 4-də ADPU-nun Şamaxı filialında Ulu Öndər Heydər Əliyevin anadan olmasının 98-ci ildönümünə həsr olunmuş silsilə tədbirlər sırasından "Uğurlu təhsil islahatlarının banisi – Ulu Öndər Heydər Əliyev" mövzusunda onlayn elmi seminar keçirilib. Seminarda filialın professor-müəllim heyəti və tələbələri, Şamaxı rayon Heydər Əliyev Mərkəzinin rəhbəri Könül Eyvazova və Yeni Azərbaycan Partiyasının Şamaxı rayon təşkilatının Gənclər Birliyinin sədri Nuranə Məmmədova iştirak ediblər. Filialın direktoru, dosent Tünzalə Yusifova Ulu Öndərin Azərbaycan təhsilinin inkişafında oynadığı roldan danışıb. Tərbiyə işləri üzrə direktor müavini Şəlalə Seyidova təlimçi qismində ətraflı çıxış edib.

**Ulu Öndər Heydər Əliyevin abidəsi ziyarət olunub**

ADPU-nun Şamaxı Filialının rəhbərliyi, professor-müəllim heyəti və tələbələri Ulu Öndər Heydər Əliyevin anadan olmasının 98-ci ildönümü münasibətilə keçirilən silsilə tədbirlər çərçivəsində mayın 6-da Ümummilli liderin Şamaxı şəhəri, Heydər Əliyev parkında ucaldılmış abidəsini ziyarət ediblər.




**"Heydər Əliyev ideyaları daim yaşayacaqdır" mövzusunda onlayn tədbir**

Mayın 7-də ADPU-nun Şamaxı filialının təşkilatçılığı ilə "Heydər Əliyev ideyaları daim yaşayacaqdır" mövzusunda onlayn tədbir keçirilib. Tədbirdə filialın professor-müəllim və tələbə heyəti, qonaq qismində Şamaxı rayon İcra Hakimiyyəti başçısının müavini Mehriban Eyubova və YAP Şamaxı rayon Təşkilatının sədri Bəxtiyar Abbasov iştirak ediblər.

Filialın direktoru, dosent Tünzalə Yusifova, M.Eyubova, B. Abbasov çıxışlarında Heydər Əliyevin Azərbaycanda dövlət və təhsil quruculuğu yolunda göstərdiyi misilsiz xidmətlərdən bəhs edib.

Filialın tədris və elmi işlər üzrə direktor müavini, YAP ADPU-nun Şamaxı Filialı təşkilatının sədri, fəlsəfə doktoru Ş.Mikayılov "Ulu Öndər Heydər Əliyev Azərbaycanda multukulturizmin banisidir", filialın tələbəsi, YAP Gənclər Birliyinin sədri M.Məhərrəmli isə "Heydər Əliyev və Azərbaycan gəncliyi" mövzularında çıxış ediblər.

**"Ulu öndər Heydər Əliyev irsində multikultural və tolerant dəyərlər" mövzusunda onlayn elmi – praktik konfrans**

Mayın 8-də ADPU-nun Şamaxı Filialı və Şamaxı regional "ASAN Xidmət" Mərkəzinin birgə təşkilatçılığı ilə "Ulu öndər Heydər Əliyev irsində multikultural və tolerant dəyərlər" mövzusunda onlayn elmi-praktik konfrans keçirilib. Tədbirdə ADPU-nun Şamaxı Filialının professor-müəllim heyəti, tələbələri, Şamaxı regional "ASAN Xidmət" Mərkəzinin rəhbərliyi və könüllüləri ilə yanaşı digər regional mərkəzlərin 50-dən çox könüllüsü iştirak edib.

**Faşizm üzərində qələbə günü qeyd olunub**

ADPU-nun Şamaxı Filialında ADPU-nun 100 illik və Şamaxı filialının 30 illik yubileyinə həsr olunmuş tədbirlərin davamı olaraq "Qələbəyə gedən yol" mövzusunda onlayn elmi-praktik konfrans keçirilib. Tədbirdə filialın professor-müəllim heyəti, tələbələri və dəvət olunan qonaqlar – Şamaxı rayon İcra Hakimiyyəti başçısının müavini M.Eyubova, AMEA Tarix İnstitutunun şöbə müdiri, Dövlət mükafatı laureatı, t.e.d., prof. T.Mustafazadə, Sumqayıt Dövlət Universitetinin Tarix-coğrafiya fakültəsinin dekanı, t.e.d., prof. A.Baxşəliyev, AMEA Nəsimi adına Dilçilik İnstitutunun şöbə müdiri, f.e.d., prof. İ. Məmmədov iştirak ediblər.

Həmçinin mayın 8-də Şamaxı filialının rəhbərliyi və əməkdaşları faşizm üzərində qələbə günü münasibətilə Şamaxı şəhərində yerləşən Şəhidlər xiyabanını ziyarət ediblər.

## Ağcabədi Filialında "Müasir gənclər və elmi innovasiyalar" mövzusunda TEC-in XV konfransı keçirilib



Mayın 17-də ADPU-nun Agcabədi Filialında Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 98-ci ildönümünə həsr olunmuş "MÜASİR GƏNCLƏR VƏ ELMİ İNNOVASİYALAR" mövzusunda Tələbə Elmi Cəmiyyətinin (TEC) XV konfransı keçirilib.

Konfransın plenar iclasını giriş sözü ilə açan filialın direktoru, dosent Mobil Məcidov Ulu Öndər Heydər Əliyevin unudulmaz xatirəsini anmaq üçün bir dəqiqəlik sükut elan edib. Direktor Ümummilli Liderin Azərbaycan təhsili və elminin inkişafındakı misilsiz xidmətlərindən danışıb. Sonra dos. M.Məcidov konfrans iştirakçılarını plenar iclasın gündəliyi ilə tanış edib.

Filialın tədris və elmi işlər üzrə direktor müavini, dosent Seymur Süleymanov "Heydər Əliyev: Azərbaycanda təhsil və elm", tərbiyə işləri üzrə direktor müavini, dosent Mahir Səlimov "Heydər Əliyev müstəqil Azərbaycan dövlətinin memarıdır", filialın TEC sədri, "İctimai, təbiət fənləri və onların tədrisi texnologiyası" kafedrasının baş müəllimi, k.t.ü.f.d. Fazil Cəfərov isə "Tələbə elmi-tədqiqat işlərinin perspektivləri" mövzularında məruzələrlə çıxış ediblər.

Plenar iclasdan sonra "Riyaziyyat, informatika və fizika", "Tarix və coğrafiya", "Azərbaycan dili və ədəbiyyat", "Pedaqogika, psixologiya və tibbi biliklər" bölmələrində keçirilən konfransda tələbə elmi-tədqiqat işlərinin müdafiəsində hər bir bölmədə fərqlənən tələbələr I, II və III yerlərə layiq görülərək diplom və sertifikatlarla təltif olunublar.

## Quba Filialı

**ADPU-nun Quba Filialında Heydər Əliyev Mərkəzinin açılışı olub**

ADPU-nun Quba Filialında 18 may – Beynəlxalq Muzeylər Günü münasibətilə Heydər Əliyev Mərkəzinin açılışı olub. Mövcud pandemiya şərtlərinə uyğun olaraq açılışda Quba rayon Mədəniyyət Mərkəzinin rəhbəri Fuad Orucov, Yeni Azərbaycan Partiyasının (YAP) Quba rayon Təşkilatının sədri Yusif Abidov, Quba rayon Heydər Əliyev Mərkəzinin direktoru Elza Orucova, Quba Soyqırımı Memorial Kompleksinin müdiri Rəxşəndə Bayramova, Quba Tarix Diyarşünaslıq Muzeyinin müdiri Məryəm Hacıyeva, Quba Bayraq Muzeyinin müdiri Vüsalə Kərimova iştirak etmişlər.

Açılışda filialın direktoru, dosent Yusif Alıyev bildirib ki, milli və dini baxımından zəngin, rəngarəng, Azərbaycanın multikultural dəyərlərinin, tolerantlıq ənənələrinin mərkəzi sayılan şimal bölgəsində yeganə ali təhsil müəssisəsi olan ADPU-nun Quba Filialında bu mərkəzin açılması olduqca önəmlidir. Çünki filial regionda elm, təhsil və mədəniyyət mərkəzi olmaqla yanaşı, həmçinin azərbaycançılıq ideologiyasının təbliği istiqamətində də böyük işlər görür.



Filialda Ulu öndərin zəngin həyat və fəaliyyətini əks etdirən tarixi fotolardan ibarət stendlərin yer aldığı və dəyirmi masa, müasir İKT resursları ilə təchiz edilmiş, 50 nəfərin sərbəst şəkildə yerləşə biləcəyi yüksək standartlara və şərq ornamentlərinə uyğun incəliklərlə hazırlanmış Heydər Əliyev Mərkəzi qurulmuşdur. Mərkəzin tərkibində Heydər Əliyev Lektoriyası da fəaliyyət göstərir.

**Azərbaycan Xalq Cümhuriyyətinin 103-cü ildönümünə həsr olunmuş elmi seminar keçirilib**

Mayın 25-də "Zoom" platforması üzərindən ADPU-nun Tarix və Coğrafiya fakültəsinin Azərbaycan tarixi kafedrası və ADPU-nun Quba filialının birgə təşkilatçılığı ilə Azərbaycan Xalq Cümhuriyyətinin 103-cü ildönümünə həsr olunmuş elmi seminar keçirilib.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov AXC-nin 103-cü ildönümünü - 28 may Respublika Gününü müqəddəs gün adlandırıb və bu münasibətlə seminar iştirakçılarını təbrik edib. C. Cəfərov Azərbaycan həqiqətlərinin dünyaya çatdırılması istiqamətində görülən işlər, burada tarixçi alimlərin rolunu vurğulayıb. Rektor bu istiqamətdə tələbələrlə iş aparılmasını vətənə keyfiyyətli şəkildə xidmət adandırıb. Tarixçiləri ideoloji cəbhənin döyüşçüləri hesab edib.



Çıxış edən ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev seminarın tarixin xatırlanması, gələcəyin proqnozlaşdırılması baxımından önəmini vurğulayıb.

ADPU Quba filialının direktoru, dosent Yusif Alıyev bildirib ki, yaşı Cümhuriyyətin yaşına bərabər olan ADPU-da bu tədbirin keçirilməsi çox önəmli, gərəkli məsələdir. Direktor qeyd edib ki, ADPU-nun Quba Filialı Azərbaycanda təhsil siyasətinin həyata keçirilməsində vəzifəsini layiqincə yerinə yetirmək üçün qarşısına önəmli məsuliyyətlər qoyub.

Daha sonra ADPU-nun "Azərbaycan tarixi" kafedrasının müdiri, dosent Naibə Əhmədova çıxışında dövlətçilik tarixindən bəhs edərək Azərbaycanda ziyalı təbəqənin formalaşmasının tarixinə nəzər salıb. Azərbaycanın müstəqillik tarixində ziyalıların rolundan bəhs edib.

Seminarda professor Xaqani Məmmədov "Azərbaycan Xalq Cümhuriyyəti Şərqdə ilk demokratik dövlətdir", dosent Kamran İsmayılov "Zəngəzur dəhlizi tarixi aspektlər", filialın əməkdaşı, t.e.d. Təhminə Əliyeva "AXC hökuməti tərəfindən ermənilərin ərazi iddialarına qarşı aparılan mübarizə", filialın direktor köməkçisi Mürvət Əliyev "AXC-nin xarici siyasəti və qonşu dövlətlərlə münasibətləri" mövzularında və ADPU-nun Cəlilabad Filialının baş müəllimi Ələsgər Mirzəzadə məruzələrlə çıxış ediblər.

## Nizami və "Xəmsə" ənənəsi

700 ildən çox tarixi olan Nizami ədəbi məktəbi Şərq xalqları mədəniyyətinin inkişafında və onun yeni istiqamətinin müəyyənləşməsində əhəmiyyətli dərəcədə rol oynamışdır. Xatırlatmaq yerinə düşər ki, Nizami ədəbi məktəbi mövcudluğunun arxasında cahanşümül ideyalar carçısı olan dahi Nizaminin Şərq şeir komandanı kimi qəbulu ilə yanaşı, Azərbaycan-türk mədəniyyətinin dərki və təsdiqi dayanır. Çünki Nizami adı, Nizami dühası Şərqə Azərbaycan-türk şeirinin (geniş mənada mədəniyyətinin) bədii-estetik, milli-fəlsəfi ecazkar nümunəsi tipində daxil olmuş, Nizami adı ətrafında formalaşan nə varsa Azərbaycan milli-mənəvi ruhunun daşıyıcısı təsirindən uzağa getməmişdir. Əlişir Nəvainin "Fərhad və Şirin" əsərinin ilk misralarından birində deyildiyi kimi:

O Gəncədə yatan böyük Nizami.
Gəncədə olsa da aramı onun,
Xəznələr üstədir məramı onun.

Və yaxud, "Yeddi səyyarə" əsərində Nizaminin Gəncə (Azərbaycan) əhlinə "incə mənalar" bəxş edən mütəfəkkir şair simasında təqdim edilməsi və söz mülkünün sultanı kimi "Çini-Maçində" tayı-bərabəri olmayan möhtəşəmlikdə canlandırılması təsadüfi deyildir.

Bir kəlamı gözəl, sözləri gövhər,
Şeir meydanında göstərib hünər,
Xərabə dünyada Gəncə əhlinə
Bəxş edib beş yeni dolu xəzinə.
Lələk qələmiylə o, ağ vərəqdə
Çox incə mənalar eylədi peyda.
Məna yox, hər sözü qənddi, şəkərdi,
Mürəkkəbi sanki müşk-ənbərdi.
Belə vəhdətini müşk ilə qəndin
Nə Hindistan görüb nə də qədim Çin.

Şərq Nizami sənətini yalnız bədii zövq mənbəyi kimi qəbul etmir, Şərq eyni zamanda həkim Nizaminin bədii-fəlsəfi hikmətlərini bir poetika və didaktika məxəzi kimi dəyərləndirir, onu öyrənməyi özü üçün zəruri hesab edir. Bu mənada Dəhləvi, Cami, Nəvai, Şahidi, Ə.Ərdəbili, Marağalı Əşrəf, Füzuli, Əbdu bəy Şirazi və s. poeziya nəhənglərinin yaradıcılığındakı Nizami təsiri "Xəmsə" süjetləri əsasında qurulan epizodların özünəməxsus bədii ifadə təkrarlığı ilə müşahidə olunmamış, onların yaradıcılıq imkanlarının, sənətlərinin bədii-estetik keyfiyyətlərinin yüksəlməsinə və yeni ideyalarla zənginləşməsinə yol açmışdır. Qururla deyə bilərik ki, Azərbaycan xalqının milli iftixarı dahi Nizaminin Şərq şeirinin



nadir siması olmaqla yanaşı, dünya sənət tarixində Azərbaycan mədəniyyətinin ecazkar tərənnümçüsü və geniş mənada Azərbaycançılıq missiyasının qüdrətli nümayəndəsidir. Şübhəsiz, Nizaminin Şərq dünyası üçün ən böyük missiyası ədəbiyyatımızın sənət emblemi olan "Xəmsə" ni yazmasıdır.

"Xəmsə" dahi Nizaminin sənət aləmində ədəbi-bədii kəşfi, eyni zamanda forma, mövzu və ideya yeniliyi idi. Lakin həmin dövrlərdə mətbələrin, ölkələr arasında əlaqə və nəqliyyat-kommunikasiyaların olmamasına rəğmən, öz mahiyyətində mənəviyyat aliliyini qoruyan, Hegelin təbirincə desək "şölələnən ruhu ilə tarixin başlanğıcına təkan verən Şərq dünyası" nda sənət aləmi üçün yeni olan ədəbiyyat hadisəsinin (yəni "Xəmsə"nin) yayılması təbii idi. Bu proses XIII əsrdən başlayaraq Azərbaycanla Hindistan, Orta Asiya, Yaxın və Orta Şərq ölkələri arasında ədəbi-mədəni əlaqələrin yaranmasına vəsilə oldu. Alternativi olmayan şeir təbi, rəvan və axıcı dil xüsusiyyətləri ilə seçilən Nizami abidəsi "Xəmsə"yə XIII əsrin sonlarından başlayaraq nəzirələrin yazılması isə Azərbaycan-Şərq ədəbi-mədəni əlaqələrinin genişlənməsinə əhəmiyyətli dərəcədə təsir göstərdi. Nizami dühasından doğan bu sənət ecazkarlığına ilk reaksiya və cavab "Xəmsə"nin yazılmasından təxminən 95 il sonra (XIII əsrin sonu) nə İrandan, nə də Turandan - uzaq Hindistandan gəldi.

*Əziz oxucu! Məqalənin davamı ilə QR kodu smartfonunuzda oxudaraq tanış ola bilərsiniz.*



**Elman Quliyev**
**ADPU-nun professoru,**
**"Türk araşdırmaları" bölməsinin müdiri**

## Qarabağ və ətraf ərazilərdə törədilən ekoloji terror

Ermənistan , Qarabağ və ətraf ərazilərini 30 ilə yaxın müddət idi ki, işğal altında saxlayırdı. Nəhayət 2-ci Qarabağ muharibəsində Ermənistan kapitulyasiyaya məcbur edildi Noyabrın 9-da Rusiyanın vasitəçiliyi ilə Azərbaycan və Ermənistan liderləri arasında Qarabağda sentyabrın 27-də başlayan hərbi əməliyyatları dayandırmaq barədə əldə edilmiş razılaşmaya əsasən Kəlbəcər rayonunu tərk etməli olan ermənilər bölgədən çıxmazdan əvvəl evləri, məktəb və xəstəxanaları yandırır, ağacları kəsir və meşələrə od vururlar. Təəssüflə qeyd etmək olar ki, bu hərəkətlər ətraf mühit problemləri ilə məşğul olan beynəlxalq qurumlardan və QHT-lərdən adekvat reaksiya görməyib. Həmçinin Azərbaycanın işğal altındakı bölgələrinə qarşı Ermənistan tərəfindən ekoloji terror uzun illər davam edib. Bölgənin ekosistemi və təbii sərvətləri son 27 ildə vəhşicəsinə məhv edilmişdir. Dəfələrlə beynəlxalq təşkilatlar Ermənistan tərəfindən Qarabağ bölgəsi və ona bitişik rayonlarda ətraf mühitə qarşı qeyri-insani hücumlar barədə həyəcan təbili çalıblar: "2016-cı ilin yanvarında Avropa Şurası Parlament Assambleyası 2085 saylı qətnamə qəbul edərək, Ermənistanın Dağlıq Qarabağ və qonşu əraziləri işğalı nəticəsində Azərbaycan vətəndaşları üçün humanitar və ekoloji problemlər yaratdığını pisləyib və Ermənistan hakimiyyətini su mənbələrindən siyasi təsir vasitələri kimi istifadəni dayandırmağa çağırıb". Mütəxəssislərin ilkin hesablamalarına görə,



Ermənistan tərəfindən illərdir törədilən ekoloji cinayətlər nəticəsində ətraf mühitə və təbii sərvətlərə dəyən zərər təxminən 265,3 milyard dollar dəyərindədir. Qısaca desək, işğal nəticəsində Qarabağ bölgəsi "ekosid" kimi xarakterizə oluna bilən ekosistemin kütləvi məhvinə uğrayıb və bu, cinayət məsuliyyəti tələb edir.

**Qarabağın flora və faunası**

Azərbaycanın füsunkar və dilbər guşəsi, dünyada çox nadir və təkrar olunmaz iqlimə, bitki örtüyünə və heyvanlar aləminə malik olan Qarabağ torpaqları uzun illər düşmən tapdağı altında qalmışdı. Nəhayət, II Qarabağ müharibəsi zamanı bu torpaqlar işğaldan azad olundu. Vətən müharibəsi nəticəsində eyni zamanda yalnız Azərbaycan üçün endemik olan, dünyanın heç bir yerində təbii halda rast gəlinməyən bir çox bitki növləri düşmən tapdağından azad edildi. Qarabağda 2500-ə qədər bitki, 460-dan çox vəhşi ağac və kol bitkisi böyüyür. Azərbaycan Respublikasının Qırmızı Kitabının (1989) ilk nəşrinə daxil olan, 140 nadir və nəsli kəsilməkdə olan bitkilərin bir çoxu Qarabağdan təsvir edilmişdir. Azərbaycan torpaqlarının 20%-nin işğal edilməsi həmin ərazilərdə flora və faunanın bir çox növlərinin məhvinə səbəb olmuşdur. Torpaqlarımızın işğalından öncə Qarabağın ümumi ərazisinin 36%-ə qədəri meşəliklərdən ibarət idi. Qarabağda yerləşən, qədim tarixə malik olan Topxana meşəsi Şuşanın nadir sərvətlərindən biridir. Şuşa ətrafındakı toprpaqların 20 faizini əhatə edən meşədə palıd, fısdıq, qaraağac kimi ağaclar vardı. Subalp və alp çəmənləri göz oxşayardı, dərin dərələrdə bulaqlar qaynayardı. Topxana əsl təbiət möcüzəsi idi. Ayı, canavar, tülkü, dovşan, cüyür və digər heyvanlar, kəklik, turac, göyərçin kimi gözəl quşlar Topxananın qoynuna sığınmışdılar. Qarabağımız kimi, Topxanamız da erməni əsirliyində qaldı. İşğalçı ermənilər sərvətlərimizi talan edir, meşələrimizi qırıb daşıyırdılar. Təxmini məlumatlara görə, Topxanadan 2000 ədəddən çox palıd və digər qiymətli ağaclar kəsilərək Ermənistana daşınıb. Meşənin ən hündür yerində ağaclar qırılaraq orada inşaat işləri aparılıb. Uzun illər işğal altında qalmış Topxana meşəsi demək olar dağıdılmış, bitki örtüyü, heyvanat aləmi məhv edilmişdir. Ermənilər zəhərli və çətin söndürülən maddələrdən istifadə edilməklə qəsdən yanğınlar törətmiş, nadir meşə örtüyünü məhv etmişdir. Bundan əlavə, son 30 ildə Azərbaycan Respublikasının Qırmızı kitabı-na salınan ayıfındığı növündən ibarət meşələri və relikt bitki sayılan, Laçın Dövlət Təbiət Yasaqlığı ərazisində yayılan qırmızı palıd ağacları kütləvi surətdə qırılaraq mebel istehsalı üçün istifadə olunur və xaricə satılırdı.Bəsitçay dövlət təbiət qoruğuda erməni terroruna məruz qalmışdır. Bəsitçay Dövlət Təbiət Qoruğu Azərbaycan hökumətinin 4 iyul 1974-cü il tarixli qərarı ilə Zəngilan rayonunda yaradılmışdır.

*Əziz oxucu! Məqalənin davamı ilə QR kodu smartfonunuzda oxudaraq tanış ola bilərsiniz.*



**Əzizağa Məlikov**
**Azərbaycan Dövlət Pedaqoji Universiteti,**
**Biologiya müəllimliyi ixtisasının 4-cü kurs tələbəsi**

# İctimai həyat - tələbə təşkilatlarının fəaliyyəti

## TGT nümayəndələri Heydər Əliyev Mərkəzində ekskursiyada oldular

Mayın 7-də ADPU TGT və Səbail rayonu Gənclər və İdman İdarəsinin (GİI) birgə təşkilatçılığı ilə TGT-nin İdarə Heyətinin 30 nəfər üzvü Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 98-ci ildönümü münasibətilə Bakı şəhərində yerləşən və dünya memarlığının incilərindən sayılan Heydər Əliyev Mərkəzinin qonağı oldular. Ekskursiyada Səbail rayonu GİI-nin rəis müavini Xasay Vəliyev və ADPU TGT-nin sədri İsmayıl Nəsirov da iştirak ediblər.

Tələbələr Ulu Öndərin irsini, Azərbaycanın tarixi və mədəniyyətini, incəsənətini əks etdirən müxtəlif eksponatlar və virtual sərgilərlə tanış olmaqla yanaşı eyni zamanda bu unikal məkanın tarixi və fəaliyyəti haqqında da məlumatlar əldə ediblər.



## ADPU-da Nailə Mirməmmədlinin xatirəsi yad edilib

Mayın 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İncəsənət və fiziki tərbiyə fakültəsinin təşkilatçılığı, ADPU Tələbə Gənclər Təşkilatının (ADPU TGT) dəstəyi ilə onlayn formada "Microsoft Teams" platformasında unudulmaz bəstəkar, uzun illər ADPU-nun əməkdaşı olmuş Nailə Mirməmmədlinin xatirəsi anılıb və bəstəkara həsr olunan "Nəğmə Dolu Ürək..." adlı kitabın təqdimatı keçrilib.



Böyük bəstəkarın 60 illik yubileyi münasibəti ilə keçirilən tədbirdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, 3 nömrəli Uşaq-Gənclər İnkişaf Mərkəzinin direktoru Lalə Cəfərova-Qati, İncəsənət və fiziki tərbiyə fakültəsinin dekanı, dosent Laçın Həsənova, İbtidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov, Musiqi və onun tədrisi texnologiyası kafedrasının müdiri, professor Zemfira Abdullayeva, Azərbaycan Teatr Xadimləri İttifaqının üzvü, BDU-nun Yaradıcılıq Mərkəzinin solisti Aslan Əzimzadə, gizir, Mahnı və rəqs ansamblının solisti Vüsal Ağayev, ADPU-nun Musiqi müəllimliyi ixtisası üzrə III kurs tələbəsi Məxfirət Hüseynova, Musiqi müəllimliyi ixtisası üzə magistrantı Təhminə Məmmədova və 80-ə yaxın tələbə iştirak edib.

Çıxış edənlər Nailə xanımla bağlı xatirələrini bölüşmüş, prof. Z.Abdullayeva bəstəkardan bəhs edən "Nəğmə Dolu Ürək..." kitabının təqdimatını etmişdir.

Tədbir zamanı Nailə Mirməmmədlinin zəngin yardıcılıq yolunu əks etdirən videoçarxlar nümayiş olunub.

## Tələbələr maarifləndirir və maariflənir

**ADPU YAP GB-nin təşkilatçılığı ilə "Heydər ömrü" adlı elmi konfrans keçirilib**



Mayın 10-da ADPU Yeni Azərbaycan Partiyası Gənclər Birliyi (ADPU YAP GB) Riyaziyyat fakültəsi təşkilatının təşkilatçılığı ilə Ümummilli lider Heydər Əliyevin anadan olmasının 98-ci ildönümünə həsr olunmuş "Heydər ömrü" adlı elmi konfrans keçirilib.

Konfransda Azərbaycan Xüsusi Xidmət Orqanlarının Veteranları İctimai Birliyinin sədri, polkovnik Şamil Süleymanov, keçmiş milli təhlükəsizlik nazirinin müavini, Sərhəd Qoşunları komandanının baş müşaviri, general-mayor, respublikanın əməkdar hüquqşünası Abbasəli Novruzov, ehtiyatda olan polkovnik, Təhlükəsizlik Alyansının üzvü Şücəddin Abdullayev, "Həkəri" qəzetinin redaktoru, "Respublika" qəzetinin müxbiri Rauf Allahverdiyev, ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin müdiri Turan Kərimli, Riyaziyyat fakültəsinin dekanı, dosent Araz Fərəcov, Riyaziyyat fakültəsinin professor-müəllim heyəti, ADPU YAP GB sədri Tərlan Ağayev və tələbələr iştirak edib.

Konfransı giriş sözü ilə açan dos. A. Fərəcov konfransın işinə uğurlar arzulayaraq ulu öndər irsinin öyrənilməsinin gənclər üçün önəmini vurğulayıb. Uzun müddət Ümummilli lider Heydər Əliyevlə birgə işləyən Ş. Süleymanov elmi məruzə ilə çıxış edib. Çıxış edən prof. A.Zamanov Heydər Əliyevin həm xüsusi xidmət orqanları, həm də təhsil sahəsi ilə bağlı fəaliyyətindən bəhs edərək konfransın hər iki sahənin vəhdətini təşkil etməsi baxımından çox əhəmiyyətli olmasını vurğulamışdır.

**ADPU YAP Gənclər Birliyi "Heydər Əliyev müasir gənclər siyasətinin banisidir" adlı görüş keçirib**



Mayın 25-də Azərbaycan Dövlət Pedaqoji Universiteti Yeni Azərbaycan Partiyası Gənclər Birliyi (ADPU YAP GB) Tarix və coğrafiya fakültəsi təşkilatının təşkilatçılığı ilə "Heydər Əliyev müasir gənclər siyasətinin banisidir" adlı onlayn görüş keçirilib. Görüşdə ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, Milli Məclisin deputatı Ramin Məmmədov, YAP GB sədri Bəxtiyar İslamov, ADPU-nun Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin müdiri Turan Kərimli, ADPU YAP GB sədri Tərlan Ağayev və 100 nəfərdən çox tələbə iştirak edib.

Görüşü giriş sözü ilə açan prof. F.Rzayev gənclərə uğurlar arzu edərək Heydər Əliyevin irsinin və onun gənclər siyasətinin həyata keçirilməsi üçün gördüyü müvafiq işlərin öyrənilməsinin vacibliyini vurğulayıb. Daha sonra millət vəkili R.Məmmədov və B.İslamov tələbə-gənclər üçün mövzu ətrafında əhatəli çıxışlar edib, H.Əliyev dühasının mənimsənilməsi və təbliğinin gənclərimizin sağlam və vətənpərvər ruhda tərbiyə olunmasında müstəsna rolundan danışıblar.

## ADPU THİK-dən "#ULUÖNDƏRDƏN1KƏLAM" tvit marafonu

ADPU Tələbə Həmkarlar İttifaqı Komitəsi (THİK) Riyaziyyat fakültəsi təşkilatı 10 may – Ümummilli Lider Heydər Əliyevin doğum günü münasibəti ilə "Twitter" platformasında tvit marafonu keçirib. Mayın 10-u, saat 21:00-da başladılmış #ULUÖNDƏRDƏN1KƏLAM marafonunda ADPU THİK-in üzvü olan 170-dən çox fəal tələbə iştirak edib. Onlar 50-dən çox şablon şəklində hazırlamış mətnləri 1 saat ərzində #ULUÖNDƏRDƏN1KƏLAM və #ADPU həştəqləri ilə paylaşıblar. Ulu Öndər Heydər Əliyevin kəlamları 1 saat ərzində "Twitter"in Azərbaycan seqmentində gündəmə (trendə) düşüb. Layihə ərzində ən çox tvit paylaşaraq fəallıq göstərən tələbələr ADPU THİK Riyaziyyat fakültəsi təşkilatı tərəfindən mükafatlandırılıb.




## Onlayn təlim: "Kvant mexanikası"

Aprelin 30-da ADPU THİK Tarix və coğrafiya fakültəsi təşkilatının təşkilatçılığı ilə "Kvant mexanikası" adlı təlim keçirilib. Qardaş ölkə Türkiyədən qatılan təlimçi Kadir Durak fizikdir və hazırda Türkiyənin Özyeğin Universitetində çalışır. O, fizika üzrə Sinqapur Milli Universitetində doktorantura təhsili alıb. Təlimdə fizika elminin sirləri, kvant və nisbilik nəzəriyyələri, həmçinin gündəlik həyatda bu prinsiplərin tənzimlənməsi və mexanikanın rolu haqqında ətraflı məlumat verilib. Diskussiya ilə keçirilən təlim aktiv və əyləncəli olub. Sonda aktiv tələbələr sertifikat ilə təltif olunublar.



## Onlayn seminar: "Qafqaz İslam Ordusu və Azərbaycanın qurtuluşu"



Mayın 27-də ADPU Təhsil Könüllüləri İctimai Birliyi (ADPU TKİB) 28 may – Respublika Günü münasibətilə "Qafqaz İslam Ordusu və Azərbaycanın qurtuluşu" mövzusunda onlayn seminar təşkil edib. "Microsoft Teams" platforması üzərindən keçirilən seminarda Azərbaycan Xalq Cümhuriyyəti və mühacirət tarixinin gənc tətqiqatçısı, İstanbul Universitetinin doktorantı Dilqəm Əhməd Qafqaz İslam Ordusunun Bakını işğaldan azad etməsi və Azərbaycan Xalq Cümhuriyyəti dövründə Qarabağ, İrəvan və Zəngəzur məsələləri və Vətən müharibəsindəki tarixi zəfərimiz haqqında məlumat verərək tələbələrlə qarşılıqlı fikir mübadiləsi aparıb.

Tədbirdə iştirak edən ADPU-nun Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin müdiri Turan Kərimli və ADPU TKİB sədri Taleh Mirzəyev iştirakçıları respublika günü münasibəti ilə təbrik edərək gənclərin bu tip mövzular ətrafında məlumatlılığının önəmini qeyd ediblər.

Seminarda 50 nəfərdən çox tələbə iştirak edib.

Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ 1921
ADPU 100

## "Finlandiya təhsil sistemi"

Dünyanın bütün ölkələrində gənc nəslin təhsil və tərbiyəsi indiki dövrdə böyük aktuallıq kəsb edir. ABŞ, Qərbi Avropa, Yaponiya, Rusiya və s. Tanınmış nüfuzlu ölkələrdə böyüyən nəslin təhsil və tərbiyəsi ilə bağlı əldə olunmuş nailiyyətlər,töhfələr bütün dünya ölkələrinə öz təsirini göstərmişdir. Eyni zamanda Azərbaycanda da dünya ölkələrinin təhsil sistemi geniş müzakirə mövzularından biri olmuşdur. Bu baxımdan bir çox ölkələr Ümumavropa təhsil məkanına inteqrasiya olunmaqla, hər bir ölkənin təhsilinin öz spesifikasına uyğun müəyyənləşməsi əsas çıxış yolu olmuşdur. Dünya hazırda vahid deyil, məhz buna görə də təhsilin hər hansı bir vahid modeli də mövcud ola bilməz. Qabaqcıl ölkələrin təhsil sisteminin tarixini öyrənməklə irəliləyişin, tərəqqinin mahiyyətini anlamaq mümkündür. Dünya üzrə mövcud olan təhsil sisteminlərindən biri də məhz Finlandiya təhsil sistemidir. Finlandiya dünyanın ən yaxşı təhsil sistemlərindən birinə sahibdir. Finlandiyada xüsusi özəl məktəblər yoxdur. Finlandiya təhsil sistemi məktəb ödənişi olmayan tam zamanlı tələbə təhsil sistemidir. Finlandiyanın mövcud təhsil sistemini:

1.körpə və uşaqlar üçün bir illik uşaq bağçası proqramı (altı yaşlı uşaqlar üçün)
2.doqquz illik məcburi məktəb (yeddi yaşından başlayaraq on altı yaşına qədər davam edən);
3.məcburi təhsildən sonra ikinci ümumi akademik və peşə təhsili;
4.ali təhsil (universitet və tətbiqi elmlər universiteti) və yetkinlər(ömür boyu)

Finlandiyanın təhsil sahəsində bərabərliyi və mükəmməlliyini təmin etmək strategiyası ictimaiyyət üçün açıq olan ictimai məktəb sisteminin qurulmasına əsaslanır.Onların strategiyasının bir hissəsi: tələbələrin evinə yaxın bir məktəbin olması üçün məktəb şəbəkəsini mümkün qədər yaymaqdır. Doqquz illik məktəbdə əsas təhsildən sonra 16 yaşlılar ikinci təhsili davam etdirə bilərlər. Onlar ikinci təhsilini akademik istiqamətdə və ya peşə təhsili istiqamətində seçə bilərlər. Hər ikisi də adətən üç il müddətinə sahiblənər və tələbələr həmçinin üçüncü təhsilini davam etdirə bilirlər. Üçüncü təhsil elmi universitetlərə və politexniklərə bölünür. Keçmişdə yalnız universitet məzunları daha yüksək dərəcə (aspirant) üçün təhsil ala bilmişdilər, lakin Bologna müqaviləsindən sonra bütün peşə məktəb tələbələri yüksək səviyyəli təhsil almağa başladılar.

**Fin təhsil sisteminin əsas xarakteristikası:**

1- İnsanların yaşından asılı olmayaraq, uşaqlar piyada və ya velosiped yolu ilə məktəbə gedərlər.Fin mədəniyyəti, uşaqların yetişdirilməsinə əhəmiyyət verir. Adətən uşaqları məktəbə valideyn gətirmir

2-Fin təhsil tədris planı sadə və ümumi bir çərçivəni müəyyənləşdirməkdən ibarətdir. Şagirdlər öz maraqları və ehtiyacları istiqamətində öz təhsil proqramlarını yaratmaq hüququna malikdirlər

3-Fənn tələbələri təhsilin ilk altı ildə qiymətləndirilmirlər. Səkkizinci sinifin sonuna qədər qiymətləndirmə öhdəliyi yoxdur və tələbələr standartlaşdırılmış imtahan sisteminə tabedirlər. Yalnız 16 yaşındaykən, onlar ümummilli birimtahan alırlar.

4-Müəllimlər sinifdə gün ərzində ortalama dörd saat dərs deyirlər. Həftədə ikisaat, peşə inkişafı üçün təlimdə iştirak etməyə həsr olunurlar.İlk məktəbdə tələbələr sinif otağında 75 dəqiqə vaxt sərf etmişlər. Amerikada bu dərəcə 27 dəqiqəyə düşür.dünyada isə ortalama 45 dəqiqə

5-Bütün müəllimlərinən azı magistr dərəcəsi var tədris cəmiyyətin gözündə ən yüksək peşələrdən biridir.




6-Öyrənmə yerinin məktəb olduğu üçün tələbələrə ev tapşırığı verilmir. Hər bir uşaq fərdi olaraq dəyərləndirilir. Uşaqlardan biri kifayət qədər yaxşı öyrənə bilmirsə müəllimləri bunu dərhal fərq edir və uşağın öyrənmə proqramını onun fərdi ehtiyaclarına görə təşkil edir. Eyni, məktəbə uyğun olmayan, cansıxıcı olan və ya proqramın qabağında olan uşaqlar üçün də tətbiq olunur. Müəllimlərin ali təhsil səviyyəsi uşaqların hər cür inkişafı müşahidə etmək və çevik hallər yaratmaq üçün ən vacib səbəbidir. Statistikaya görə, uşaqların 30%-i təhsilin ilk 9 ilində xüsusi proqramlar ilə dəstəklənir.

7-Fin məktəblərində bol idman var, amma idman etmək üçün heç bir komanda yoxdur. Müsabiqə Fin mədəniyyətində üstünlük qazanmaq üçün dəyərləndirilən bir şey deyil.

8-Finlandiya xüsusi məktəbi yoxdur və bütün təhsil xərcləri dövlət tərəfindən dəstəklənir. Demək olar ki, bütün məktəblərdə eyni səviyyədə uğurlar var.

**Finlandiya təhsil sisteminin digər təhsil sistemindən əsas fərqli cəhətləri.**

Təhsil sistemi bütün uşaqlar üçün bərabər imkanlarla təmin edir. Bərabərlik anlayışına qeyri-adi dəyər verilir. Bütün uşaqlar öz kəşfiyyatı və bacarıqlarından asılı olmayaraq həmin siniflərdə oxuyurlar. Bir çox Avropa ölkəsi və ABŞ ilə müqayisədə Finlandiya təhsilinə ayrılan büdcənin daha çoxu sinif mühitində əksini tapır. Müəllimlər və menecerlər demək olar ki, eyni maaş alırlar. Buna görə Finlandiya təhsil xərcləri çox aşağıdır. Finlandiya təhsilinin digər təhsil sistemləri ilə müqayisəsinə nəzər yetirsək:

1-Digər ölkərdə uşaqları məktəbə ailələri və ya məktəb xidməti maşınları aparırlar.Uşaqlar birinci sinifdə məktəblərə gəzinti və ya velosipedlərlə təmin olunurlar. Ailələr xüsusi hallarda istisna olmaqla,uşaqlarını məktəbə aparırlar.

2-Digər ölkərdə tədris planı və dərs kitabları üzərinə quruludur. Fin məktəblərində çox sadə və dəyişməz bir tədris planı istifadə olunur. Müəllimlər hər il kitabın daxilini yəni planını özləri seçirlər, lakin dərslik yönümlü təhsil sistemi tətbiq etmirlər və daha çox interaktiv dərslər keçirirlər.

3-Digər ölkələrdə yazılılardan alınan yüksək qiymət "müvəffəqiyyət" olaraq görülər. Fin məktəblilərə notlar ilk 6 ildə verilmir 16 yaşına çatdıqdan sonra tələbələr ümummilli bir imtahan alırlar.

4-Digər təhsil sistemində şagirdlərə yalnız dərs məsuliyyəti verilir. Fin təhsili sistemində, tələbələr, məktəbdəki bütün işləri birlikdə edirlər. Buna görə fin məktəblərində heç bir işçi yoxdur və tələbələr öz məktəb fəaliyyətlərini etməklə öz məsuliyyət hisslərini inkişaf etdirirlər.

5-Digər məktəblərində şagirdlər taxta partada otururlar. Finladiya məktəblərində dərslər tələbələr rahat hiss edə biləcək şəkildə tərtib edilir. Dərslər "öyrənmə yolu ilə" hazırlanır və məktəb binaları uşaqların evdə hiss etmələri üçün nəzərdə tutulub.

6-Dünyanın təhsil sisteminin çoxunda xüsusi məktəblərdə dərs saatı 8, dövlət məktəblərində isə bunlara əlavə olaraq, Etüt və xüsusi dərslərlə gündə 13-14 saatlıq sıx bir təhsil müddəti vardır. Finlandiyada orta gündəlik saat 4-dir.

7- Digər müəllimlərinin tədris proqramının intensivliyi səbəbindən özlərini inkişaf etdirməyə vaxtları yoxdur.Fin müəllimləri həftədən azı 2 saat xidmət içi təhsilə qatılmalıdırlar.

**Tərlan AĞAYEV**
*Tələbə araşdırması*

**BAŞSAĞLIĞI**

ADPU rəhbərliyi və kollektivi universitetin müəllimi Aslan Şeləmənov və tanınmış ictimai-siyasi və təhsil xadimi, ADPU-nun rektoru olmuş professor Nizami Xudiyevin vəfatından kədərləndiyini bildirir, yaxınlarına başsağlığı verir. Allah rəhmət eləsin!


**Aslan Şeləmənov**
Müəllim


**Professor Nizami Xudiyev**
1994-1996-cı illərdə
ADPU-nun rektoru



Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı"nda çap olunub. Sifariş №: 1031

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.